Həmd olsun Allaha ki, bizə hidayət verdi, bizi doğru yola yönəltdi, bizi müsəlmanlardan - Ona təslim olanlardan etdi. Bizə peyğəmbərlərini və kitablarını göndərdi, haqqı göstərdi. Onların vasitəsilə Allah öz haqqını, hərkəsin ayrıca haqqını, digər insanların haqqını və digər məxluqatların haqqını bəyan etdi.

Müaz bin Cəbəldən (Allah ondan razı olsun!) rəvayət olunur: *"Bir dəfə Peyğəmbər (s.a.v.) yol gedərkən uzunqulağa minib, məni də tərkinə almışdır. O, mənə dedi: "Ey Müaz, bilirsənmi Allahın Öz bəndələri və bəndələrin Allah üzərindəki haqqı nədir?" Dedim: "Onu Allah və Rəsulu daha yaxşı bilər". Dedi: "Allahın bəndələri üzərindəki haqqı odur ki, onlar Ona ibadət etsinlər və Ona heç nəyi şərik qoşmasınlar. Bəndələrin Allah üzərindəki haqqı odur ki, Ona heç nəyi şərik qoşmayanlara əzab verməsin..."*.

Bu hədis Allahın və bəndələrin haqqını açıq-aydın göstərir. Müqəddəs kitabımızda bu hədisi təsdiqləyən ***"Allaha ibadət edin və Ona heç nəyi şərik qoşmayın"*** kimi ayələr çoxdur.

Yuxarıda göstərdiyimiz haqqlardan biridə digər insanların haqqıdır. Digər insanlara hər kəsin ailəsi, valideynləri, qohum və yaxınları, qonşuları, yaşadığı kənd, şəhər, rayon, dövlət, millət və nəhayət ümmətin əhalisi daxildir. Bu çox saylı insanların içərisində valideyn və qohumların xüsusi mövqeyi, yeri var. İnsanın borcu, əvvəlcə onu yoxdan var edən Allaha ibadət etmək, sonra da Onun yaratdıqlarına şəfqət və mərhəmət göstərməkdir. Yaradılmışlar içərisində birincilik, üstünlük onun var olmasının, dünyaya gəlməsinin səbəbi olan ana və ataya verilmiş, onlara itaət edilməsi əmr edilmişdir.

Alqışlar olsun Allaha ki, **"Biz insana ata-anasına yaxşılıq etməyi, (onlarla gözəl davranmağı) tövsiyə etdik..."** (Ənkəbut, 8; Əl-Əhqaf, 15 və s), **"Mənə və ata-anana şükr et..."** (Loğman, 14) kimi ayələrlə bizə ata-ana haqqının ucalığını, Özündən sonra insanlar içərisində şükrə, itaətə hamıdan əvvəl ata-ananın layiq olduğunu bildirdi. Həmçinin **"Qohumluq əlaqəsini kəsməkdən həzər edin! Şübhəsiz ki, Allah sizin üzərinizdə nəzarətçidir"** (Ən-Nisa, 36) kimi çox-saylı ayələrlə qohum və yaxınların haqqını da verməyi əmr etdi.

Son zamanlarda uzun illər hökm sürən "dinsiz"likdən sonra insanlar arasında dinə, Allaha qayıdış başlanmışdır. Xüsusilə gənclərimiz Allaha itaət və ibadət yoluna qayıdır, pis əməllərdən, haramlardan və günahlardan çəkinməkdədirlər. Lakin İslamı düzgün təbliğ etməyənlərin xətaları, elmsizliyi, hikmətdən uzaq olmaları ucbatından və həmçinin bu xüsusiyyətlərə malik İslamı qəbul edən bəzi gənclərimiz ata-ana haqqını, qohum və yaxınlarının haqqını düzgün dərk etmirlər. Namaz qılmaqla, oruc tutmaqla özlərini Allah qarşısında olan haqqlarını vermiş sayırlar. Namaza, oruca yeni başlayanların əksəriyyəti, hətta uzun müddət islamda olanların bəziləri ailə və qohum münasibətlərini düzgün qurmurlar. Nəticədə haqlı narazılıqlar, hətta düşmənçilik münasibəti yaranır. Ata-ana və övladlar

arasında, qohum və yaxınlar arasında bir-birinə nifrət yaradaraq, haqsız və çox təhlükəli ittihamlar edərək (bir-birini kafir kimi ittiham etmək), günah və xətalara və s. xoşa gəlməz hallara və nəticədə dinə, islama ləkə salacaq zidd hərəkətlərə, əməllərə yol verirlər.

Özümüzə və qardaşlarımıza bu və digər məsələlərdə tövbə etməyi tövsiyə edirik. Çünki, Allah-Sübhənəhu və Təala bütün möminlərə tövbə etməyi əmr edərək buyurur: **“Ey möminlər! Hamınız Allaha tövbə edin ki, bəlkə, nicat tapasınız!”** (Ən-Nur, 31).

Ümidvaram ki, Allah tövbələrimizi qəbul edər. Çünki Allah təala buyurur: **“Məgər onlar bilmirlər ki, Allah qullarından tövbə qəbul edər... Allah tövbələri qəbul edəndir, Rəhmlidir?! ”** (Ət-Tövbə, 104).

Allahdan bizi və müsəlman qardaşlarımızı faydalandırmağı, bunu onlara doğru yönəlmiş çağırış və haqlı nəsihət hesab etməyi rica edirik.

**Mövzu ilə bağlı Quran ayələri.**

- **«Yadınıza gətirin ki, Biz bir zaman İsrail oğullarından: «Allahdan qeyrisinə ibadət etməyin, valideynlərinizə, yaxın qohumlarınıza, yetimlərə, yoxsullara ehsan (yaxşılıq, kömək) edin, insanlarla xoş danışın, namaz qılın, zəkat verin!»-deyə əhd-peyman aldıq...»** (əl-Bəqərə, 83).
- **«Yaxşı əməl heç də (ibadət vaxtı) üzünüzü günçıxana və günbatana tərəf çevirməkdən ibarət deyildir. Yaxşı əməl sahibi əslində Allaha, axirət gününə, mələklərə, kitaba (Allahın nazil etdiyi bütün ilahi kitablara) və peyğəmbərlərə inanan, Allaha məhəbbəti yolunda (və ya mal-dövləti çox sevməsinə baxmayaraq) malını (kasıb) qohum-əqrabaya, yetimlərə, yoxsullara, (pulu qurtarıb yolda qalan) müsafirlərə, dilənçilərə və qulların azad olunmasına sərf edən, namaz qılıb zəkat verən kimsələr, eləcə də əhd edəndə əhdinə sadiq olanlar, dar ayaqda, çətinlikdə (ehtiyac, yaxud xəstəlik üz verdikdə) və cihad zamanı (məşəqqətlərə) səbr edənlərdir. (İmanlarında, sözlərində və əməllərində) doğru olanlar onlardır. Müttəqi olanlar da onlardır!»** (əl-Bəqərə, 177).
- **«(Ya Məhəmməd!) Səndən (Allah yolunda) nə verəcəkləri haqqında soruşanlara söylə: «Malınızdan verəcəyiniz şey ata-anaya, (yoxsul) qohumlara, yetimlərə, miskinlərə və (yolda pulu qurtaran) müsafirlərə məxsusdur»...** (əl-Bəqərə, 215).
- **«Ey insanlar! Sizi tək bir şəxsdən (Adəmdən) xəlq edən, ondan zövcəsini (Həvvanı) yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun! (Adı ilə) bir-birinizdən (cürbəcür şeylər) istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən həzər edin! Şübhəsiz ki, Allah sizin üzərinizdə nəzarətçidir!»** (ən-Nisa, 1).
- **«Allaha ibadət edin və ona heç bir şeyi şərik qoşmayın! Ata-anaya, qohum-əqrabaya, yetimlərə, yoxsullara, yaxın və uzaq qonum-qonşuya, yaxın yoldaş və dostlara, (pulu qurtarıb yolda qalan) mü-**

**safirlərə, sahib olduğunuz qul və kənizlərə yaxşılıq edin! Həqiqətən, Allah özünü bəyənənləri və lovğalıq edənləri sevməz!»** (ən-Nisa, 36).

- **«O kəslər ki, Allahın birləşdirilməsini əmr etdiyi şeyləri birləşdirir (qohumluq əlaqələrini qoruyub saxlayır, möminlərə hörmət edir), Rəbbindən və (qiyamət günü çəkiləcək) pis haqq-hesabdan qorxurlar»** (ər-Rəd, 21).
- **«(Ya Rəsulum!) De ki: «Gəlin Allahın sizə nələri haram etdiyini deyim: «Ona heç bir şərik qoşmayın, ata-anaya yaxşılıq edin, kasıblıq üzündən uşaqlarınızı öldürməyin. Sizin də, onların da ruzisini Biz veririk... Allah bunları sizə tövsiyə etmişdir ki, bəlkə, ağlınız başınıza gəlsin!»** (əl-Ənam, 151).
- **«Həqiqətən, Allah (Quranda insanlara) ədalətli olmağı, yaxşılıq etməyi, qohumlara (haqqını) verməyi (kasıb qohum-əqrabaya şəriətin vacib bildiyi tərzdə əl-tutmağı) buyurar, zina etməyi, pis işlər görməyi və zülm etməyi isə qadağan edər. Allah sizə, bəlkə, düşünüb ibrət alasınız deyə, belə öyüd-nəsihət verir!»** (Ən-Nəhl, 90).
- **«Rəbbin yalnız Ona ibadət etməyi və valideynlərə yaxşılıq etməyi (onlara yaxşı baxıb gözəl davranmağı) buyurmuşdur. Əgər onların biri və ya hər ikisi sənin yanında (yaşayıb) qocalığın ən düşkün çağına yetərsə, onlara: «Uf!»-belə demə, üstlərinə qışqırıb acı söz söyləmə. Onlarla xoş danış! Onların hər ikisinə acıyaraq mərhəmət qanadının altına alıb: «Pərvərdigara! Onlar məni körpəliyimdən (nəvazişlə) tərbiyə edib bəslədikləri kimi, Sən də onlara rəhm et!»-de. Rəbbiniz ürəklərinizdə olanları (qəlblərinizin sirrlərini) ən yaxşı biləndir. Əgər əməlisaleh olsanız (ata-ananıza bilmədən etdiyiniz pislikdən peşman olub tövbə etsəniz və bundan sonra onlarla yaxşı davransanız, bilin ki,), Rəbbiniz, həqiqətən, tövbəkarları bağışlayandır! Qohum-əqrabaya da, miskinə də, (pulu qurtarıb yolda qalan) müsafirlərə də haqqını ver...»** (əl-İsra, 23-26).
- **«Biz insana ata-anasına yaxşılıq etməyi (onlarla gözəl davaranmağı) tövsiyə etdik...»** (əl-Ənkəbut, 8).
- **«(Ey Məhəmməd!) Yaxın qohuma, yoxsula, miskinə, (pulu qurtrıb yolda qalan) müsafirə (Allahın vacib buyurduğu) haqqını ver. Allah rizasını (Allahın camalını) diləyənlər üçün bu daha xeyirlidir. (Axirətdə) nicat tapanlar (mətləbinə yetişənlər) məhz onlardır!»** (ər-Rum, 38).
- **«Biz insana ata-anasına yaxşılıq etməyi (valideyninə yaxşı baxmağı, onlarla gözəl davranmağı) tövsiyə etdik. Anası onu (bətnində) çox zəif bir halda daşımışdı. Uşağın süddən kəsilməsi isə iki il ərzində olur. (Biz insana buyurduq:) «Mənə və ata-anana şükr et. Axır dönüş Mənədir!»** (Loğman, 14).
- **«Biz insana ata-anasına yaxşılıq etməyi (valideynləri ilə gözəl davranmağı, onlara yaxşı baxmağı) tövsiyə etdik. Çünki anası onu**

**(doqquz ay bətnində) zəhmətlə gəzdirmiş, əziyyətlə doğmuşdur. Onun (ana bətnində) daşınma və süddən kəsilmə müddəti 30 aydır. Nəhayət (insan) kamillik həddinə yetişib qırx yaşa çatdıqda belə deyər: «Pərvərdigara! Mənə mənim özümə və ata-anama əta etdiyin nemətə şükr etmək və Sənə xoş gedəcək yaxşı əməl etmək üçün ilham ver, nəslimi əməlisaleh et. Mən (günahlardan) Sənə tövbə etdim, və şübhəsiz ki, mən müsəlmanlardanam! (Özümü cani dildən Allaha təslim edənlərdənəm!)» Belələri (dünyadakı) yaxşı əməllərini qəbul edəcəyimiz, günahlardan keçəcəyimiz və onlara verilmiş doğru vədə müvafiq olaraq Cənnət əhli içərisində olacaq kimsələrdir»** (əl-Əhqaf, 15-16).

Mənəvi təmizlənmə, paklıq-Peyğəmbəri (s.a.v.) göndərərək Allahın onun qarşısına qoyduğu vəzifələrdən biri, risalələrin son qayəsi və səmərəsidir.

Allah-təala Peyğəmbəri (s.a.v.) göndərməklə insanlara göstərdiyi mərhəmət haqqında buyurur: **«...Bu Peyğəmbər-əvvəllər haqq yoldan açıq-aşkar azsalar da-onlara Allahın ayələrini oxuyar, onları (günahlardan, şirk və küfr çirkabından) təmizləyər, onlara kitabı və hikməti (Quranı və şəriəti) öyrədər»** (əl-Cumuə, 2).

**«Allah möminlərə lütf və mərhəmət göstərdi. Çünki onların öz içərisindən özlərinə Allahın ayələrini oxuyan, onları (pis əməllərdən) təmizləyən, onlara kitabı (Quranı) və hikməti öyrədən bir peyğəmbər göndərdi. Halbuki, bundan əvvəl onlar açıq-aydın zəlalət içərisində idilər»** (Ali-İmran, 164).

Allah-təala, bu iki mübarək ayədə buyurduğu kimi, Peyğəmbəri (s.a.v.) göndərməklə bizə böyük lütf və mərhəmət göstərmişdir. Peyğəmbərin (s.a.v.) vəzifələrindən biri də Allahın ayələrini insanlara oxumaqdır. Bundan başqa, Peyğəmbər (s.a.v.) bu milləti onlara oxuduğu, özünə vəhy olunmuş Allah kəlamı ilə mənən saflaşdırır və Kitab və Hikməti öyrətməklə onları Cəhalət zülmətindən çıxarır. Haqqında danışılan Kitab-Quran, Hikmət isə bəşəriyyətin işlərini yoluna qoyan faydalı elmdir. Buna görə də Sünnə hikmətdəndir və Quranın özündə də insanlar üçün hikmət gəlmişdir.

Nəfslərin mənəvi təmizlənməsi onların öz qəbahətlərindən təmizlənməsi, sağlamlaşdırılması deməkdir.

Mənəvi cəhətdən təmiz insan, yaxşı, pak, ruhları ləkələyən hər hansı bir fırıldaq, kin, həsəd, nifrət və düşmənçilik hissindən uzaq olan insandır. Allah-təala buyurur:

**«And olsun günəşə və onun işığına (günəşin qalxdığı vaxta), and olsun günəşin ardınca çıxan aya, and olsun günəşi parlaq edən gündüzə. And olsun günəşi örtən gecəyə, and olsun göyə və onu yaradana, and olsun yerə və onu yaradana, and olsun nəfsi (insanı və ya insan nəfsini) yaradana, sonra da ona günahlarından və pis əməllərdən çəkinməsini (xeyir və şəri) öyrədənə ki, nəfsini (günahlardan) təmizləyən mütləq nicat tapacaqdır! Onu (günaha) batıran isə, əlbəttə, ziyana uğrayacaqdır»** (əş-Şəms, 1-10).

Başqa ayələrdə Allah-təala buyurur ki, bu cür təmizlik, yaxşılıq və paklıqla seçilməyən adam Cənnətə daxil olmaz. Allah-təala bunu belə buyurur:

**«Rəbbindən qorxanlar da dəstə-dəstə Cənnətə gətiriləcəklər. Nəhayət, ora çatınca onun qapıları açılacaq və Cənnət gözətçiləri (onlara): «Sizə salam olsun, siz yaxşılıq etmişsiniz, həmişəlik bura daxil olun!»-deyəcəklər»** (əz-Zümar, 73).

Bu ayədən göründüyü kimi, onların Cənnətə daxil olmalarının səbəbi etdikləri «yaxşılıq»dır ki, səadətin səmərəsi və qayəsidə budur.

Bu həmçinin nəfsin təmizlənməsi deməkdir ki, Allahın salavatı və salamı olmuş Peyğəmbəri bundan ötrü gəlmişdir.

Tovhid, ibadət, namaz, oruc, zəkat, həcc, valideynlərə hörmət, qohumluq əlaqələrini qorumaq, əxlaqsızlıq və haram işlərdən uzaq olmaq, ədalət və xeyirxahlıq naminə həyata keçirilən qarşılıqlı münasibətlərlə əlaqədar olan islam ayinlərinin hamısı bu mənəvi təmizlənmənin dayaqlarından və tərkib hissələrindən biri, ya da onu doğuran və ona aparan vasitələr olur.

Mənəvi təmizlənmənin bu mənalarını tam aydındığı ilə bilmək və bu işdə heç bir şübhə yeri qoymamaq üçün Allah-təalanın öz Peyğəmbərini (s.a.v.) bu sözlərlə vəsf etdiyini bilmək kifayətdir: **«Doğrudan da, sən böyük bir əxlaq sahibisən»** (Nun və ya Qələm, 4). Bu əxlaq mənəvi təmizlənmənin bütün növlərini əhatə edən Allah Kitabına əməl etməklə özünü göstərirdi. İmam əl-Buxarinin «Səhih»ində göstərildiyinə görə Səd bin Himam Aişədən (Allah ondan razı olsun!) Peyğəmbərin əxlaqı barədə soruşanda o cavab vermişdir: *«Onun əxlaqı Qurandan ibarət idi»*.

Buna görə də Allahın elçisi (s.a.v.) demişdir: *«Mən elə mömin əxlaqını tamamlamağa göndərilmişəm»* (əl-Əlbani, «Səhih hədislər», 45; əl-Buxari, «əl-Ədəb əl müfrəd»; əl-Hakim; Əhməd).

Allahın elçisinin (s.a.v.) Öz risalətini bununla məhdudlaşdırması bizə bütünlüklə İslam risalətinin mənəvi təmizlənmə və paklanma risaləti olmasına dair kamil dəlil verir. Bir halda ki, biz İslamın təmizlik və saflıq dini olduğunu və Allahın elçisinin (s.a.v.) yalnız təmizliyi və paklığı bərqarar etmək üçün göndərildiyini bildik, onu da həmçinin bilməliyik ki, Peyğəmbər (s.a.v.) mənəvi təmizliyi və paklığı həm nəzəri, həm də əməli cəhətdən tamamlayıb başa çatdırdı. Ona görə də Allahın elçisinin (s.a.v.) ata-anaya yaxşılıq etmək, qohumluq əlaqələrini qorumaq kimi vacib məsələlərlə bağlı hədislərini nəzərinizə çatdırırıq.

• *Əbu Əbdürrəhman Abdullah bin Məsud (Allah ondan razı olsun!) rəvayət edir ki: «Allahın rəsulundan (s.a.v.): Allah dərgahında hansı əməl daha sevimlidir?»-deyə soruşdum. «Vaxtında qılınan namaz»-deyə cavab verdi. Sonra hansı?-deyə soruşdum. Dedi: «Ata-anaya yaxşılıq etmək». Sonra hansı? - deyə soruşdum. Buyurdu ki: «Allah yolunda cihad etmək»* (əl-Buxari; Kitabul-Məvakit və Kitabul-Tovhid; Müslim; Kitabul-İman, 85).

Rəsulullah (s.a.v.) vəziyyətə görə söz söylədiyindən bu növ (hansı

əməl daha fəzilətlidir?) suallara verdiyi cavablar yerinə görə dəyişik olmuşdur.

Bu, hədislərin bir-birinə zidd olması demək deyil. Çünki Rəsulullah (s.a.v.) sual verənin nəyi demək istədiyinə, ona necə cavab verilməsinin daha uyğun olduğuna diqqət edər və ona uyğun ifadəni söyləyərdi.

Hədisdə, Allahın qulları üzərindəki xalis haqqı olan Allah və Rəsuluna şəhadətdən sonra ən fəzilətli əməlin namaz olduğu ifadə edilir. İnsan haqqlarından ən üstününün də ana-ata haqqı olduğu açıqlanmış, sonra da cihadın mərtəbəsi vurğulanmışdır.

• *Əbu Hureyrədən (Allah ondan razı olsun!) Rəsulullahın (s.a.v.) belə buyurduğu rəvayət olunur: «Övlad, atasının haqqını, ancaq başqasının kö-ləsi olaraq tapıb, sonra onu satın alaraq azad etməklə ödəyə bilər»* (Müslim; Kitabul-İtq, 1510, əl-Buxari, Əbu Davud; 5137, ət-Tirmizi; 1907, İbn Macə).

Hədisin digər mənası da belədir: «Övlad, atasını kölə olaraq tapıb, satın alaraq azad etsə belə, yenə onun haqqını ödəmiş olmaz».

• *Əbu Hureyrədən (Allah ondan razı olsun!) Rəsulullahın (s.a.v.) belə buyurduğu rəvayət edilir: «Allaha və axirət gününə inan qonağına hörmət etsin. Allaha və axirət gününə inanan yaxınları ilə münasibətlərini kəsməsin. Allaha və axirət gününə inanan ya xeyirli söz söyləsin, ya da (xeyir söyləməyəcəksə) sussun»* (əl-Buxari; Kitabul-Ədəb, Müslim; Kitabul-İman, 47).

Yaxınlarla (qohum-əqraba ilə) münasibəti saxlamağın vacibliyində ixtilaf yoxdur. Bu münasibəti kəsmə, şübhəsiz, haramdır. Ancaq münasibəti qorumanın müxtəlif yolları var. Gedib-gəlməyə müxtəlif səbəblərdən imkan yoxdursa, heç olmasa məktublaşmaq, salamlaşmaq, zəngləşmək kimi yollardan güc çatdığı qədər istifadə etmək lazımdır.

• *Əbu Hureyrədən (Allah ondan razı olsun!) Rəsulullahın (s.a.v.) belə dediyi rəvayət olunur: «Uca Allah məxluqatı yaratdığı zaman, əqrabalıq haqqı hüzuruna duraraq belə dedi: «Bu durum, qardaşlıq əlaqəsini kəsəndən sənə sığınma durumudur». Allah-təala: «Bəli, səninlə əlaqə saxlayanla, əlaqə saxlamağıma, səninlə münasibəti kəsənlə münasibəti kəsməyimə razı deyilsənmi?» buyurdu. «Bəli, buna razıyam» dedi. Allah da: «Bu sənin üçündür» (Bunu sənin üçün edirəm) buyurdu. Peyğəmbərimiz bu* sözlərdən sonra: «İstəsəniz, bu ayələri oxuyun» buyurdu: **«Əgər (Məhəmməd əleyhissəlamdan) üz döndərsəniz, sizdən yer üzündə fitnə-fəsad törətmək və (Cahiliyyət dövründə olduğu kimi) qohumluq tellərini qırmaq gözlənilməzmi?! Onlar (münafiqlər, fitnə-fəsad törədənlər) Allahın lənət etdiyi (qulaqlarını) kar və gözlərini kor etdiyi kimsələrdir!»** (Məhəmməd, 22-23). (əl-Buxari; Kitabul-Ədəb, Müslim; Kitabul-Birr vəs-Sila, 2554).

Əl-Buxarinin qeyd etdiyi başqa rəvayətdə Allah qohumluq əlaqələrinə belə buyurmuşdur*: «Səni qoruyanı mən də qoruyar, ona rəhmətimi davam etdirərəm, səni qorumayıb əlaqəsini kəsəndən də mən rəhmətimi*

*kəsərəm»*.

• *Əbu Hureyrədən (Allah ondan razı olsun!) belə rəvayət edilmişdir: «Rəsulullahın (s.a.v.) yanına bir adam gəlib soruşdu: -«Ey Allahın Rəsulu, yaxın münasibət bəsləməyimə ən layiqli insan kimdir?»*

*Dedi:-Anan.*

*Soruşdu:-Sonra kim?*

*Dedi:-Anan.*

*Soruşdu:-Sonra kim?*

*Dedi:-Anan.*

*Soruşdu:-Sonra kim?*

*Dedi:-Atan.*

(əl-Buxari; Kitabul-Ədəb, Müslim; Kitabul-Birr vəs-Sila, 2548).

Digər bir rəvayətə görə, gələn adam soruşub: *«Ey Allahın Rəsulu, yaxşı münasibət bəsləməyimə ən layiqli insan kimdir?» Peyğəmbərimiz suala yuxarıdakı kim üç dəfə «anan» deyərək cavab verib. Dördüncü dəfə isə «atan», sonra sıra ilə «yaxın qohumların, əqrabaların» deyib.*

Hədis əqraba ilə yaxşı münasibətdə olmağa, bunların əvvəlində ananın, sonra atanın və daha sonra dərəcələrinə görə yaxınların gəlməsinə dəlildir. Ananın əvvəldə gəlməsi uşağı uğrunda bir çox məşəqqətlərə qatlanmasına görədir.

Alimlər ananın üç dəfə deyilməsinin səbəbini hamiləlik dövrü, doğum məşəqqəti və əmizdirmə əziyyəti ilə izah edirlər.

• *Əbu Hureyrədən (Allah ondan razı olsun!) Rəsulullahın (s.a.v.) belə buyurduğu rəvayət olunur: «Ana-atasının və ya onlardan birinin ixtiyarlıq yaşına çatıb, (onlara hörmət etmə səbəbi ilə) cənnətə girməyinin burnu yerə sürtülsün, burnu yerə sürtülsün, burnu yerə sürtülsün»* (Müslim; Kitabul-Birr vəs-Sila. 2551, Əhməd bin Hənbəl).

Hədis ana-ataya itaətdə olmağa həvəsləndirir və bunun savabının böyüklüyünü bildirir. Ataya, ataya ixtiyarlıq (qoca) yaşlarında yaşamaq üçün vasitələrini vermək, xidmətlərində durmaq kimi itaətlər cənnətə girməyə vəsilə olur. Çünki onlar yaşlarının bu vaxtında daha çox qayğıya möhtacdırlar. İşgörmə qabiliyyətləri azaldığı, itirildiyi üçün övladlarının yardım və xidmətlərini daha çox gözləyirlər. Uşaqlıqda əziyyət çəkib böyütdüyü övladlarının qocaldıqları zaman yardım etməmələri onları çox üzər, təəssüfləndirər. Bu, övladları üçün böyük nankorluq sayılır. Belə vəfasız hərəkətin sonu da cənnət nemətlərindən məhrumiyyətlə cəzalandırılmaqdır.

• *Əbu Hureyrədən (Allah ondan razı olsun!) rəvayət edildiyinə görə bir nəfər peyğəmbərin yanına gəlib dedi: «Ya Rəsulullah! Mənim qohumlarım var. Onlarla münasibətimi saxlayıram, onlar isə mənimlə əlaqəni kəsirlər. Onlara yaxşılıq edirəm, onlarsa mənə pislik edirlər. Mən onlarla yumşaq davranıram, onlarsa mənimlə sərt və qaba davranırlar». Buna cavab olaraq Peyğəmbər (s.a.v.) buyurdu: «Əgər sən dediyin kimi münasibət bəsləyirsənsə və bu şəkildə davranmada davam etdikcə onlara qızğın kül*

*yedirmiş kimi olursan və Allahın yardımı səninlə bərabərdir»* (Müslim; Kitabul vəs-Sila, 2558).

Hədis, qohumluq əlaqələrini kəsənlərin vəziyyətlərini bənzətmə ilə öyrədir. Rəsulullah (s.a.v.) bu adamın nümunəvi davranışı qarşısında, əqrabasının göstərdikləri sərtlik və qabalığa görə başlarına gələcək ağrı və iztirabı isti kül yeyənin iztirabına bənzətmişdir. Yəni onunla qohumluq əlaqəsini kəsib, ona əziyyət verdikləri üçün günah edirlər. Çünki yaxşılığa yaxşılıqla cavab vermək müsəlmanın şüarıdır.

Hədisdən həm də pislik edənə yaxşılıq etməkdə davam etməyə şəriətlə icazə verilməsi aydınlaşır. Çünki pislik edən nə vaxtsa peşman olar, yaxşılığa yaxşılıqla cavab verməyə başlayar. Belə etməsə, Allahın rəhmətindən uzaqlaşdıqca, uzaqlaşar.

• *Ənəs (Allah ondan razı olsun!) Rəsulullahın (s.a.v.) belə buyurduğunu rəvayət etmişdir: «Ruzisinin bol olmasını və ömrünün uzun olmasını istəyən qohumlarını ziyarət etsin, onlarla yaxşı münasibətdə olsun»* (əl-Buxari; Kitabul-Ədəb və Kitabul-Buyu, Müslim; Kitabul-Birr vəs-Sila, 2557, Əbu Davud; 1693, İbn Macə və Əhməd bin Hənbəl).

Hədis, qohumluq əlaqələrinin ruzinin artırılmasına, əcəlin gecikdirməsinə təsirini göstərir. Bu zaman normal sual meydana çıxır:

Əcəllər və ruzilər əvvəlcədən müəyyən (təqdir) edilməmişdirmi? Və bu hədis Allahın **«Və (bilin ki) Allah əcəli çatan heç kəsə möhlət verməz...»** (əl-Munafiqun, 11) ayəsi ilə ziddiyyət təşkil etmirmi?

Alimlər bu suallara bir neçə cür cavab vermişlər:

Ayədən bilindiyi kimi əcəl və ruzilər müəyyənləşdirilmişdir. Ancaq hədisdə nəzərdə tutulan əlavə:

a) Ruzi bolluğu və bədən sağlığıdır. Ərəblər zənginliyə «həyat», kasıblığa «ölüm» deyirlər.

b) Ruzi əlavəsi və əcəlin gecikdirilməsi mələklərə nisbətdir və Lövhi-Mövhuzda (Allah dərgahında) yazılıdır. Allahın elmi başqa, yazılan şey başqadır. Yazılan bəzən pozula bilir, ancaq elmi dəyişməz. Bəlkə də buna görədir ki, həzrəti Ömər (Allah ondan razı olsun!): «Ey Rəbbim! Məni şikayət edən (şikayətçi) kimi yazdınsa, sil» deyərmiş, «Sənin elmində şikayət edənəmsə, məni dəyişdir» deməzmiş. Çünki Allahın olacaq bir şeyi bilməsi əsla dəyişməz və bildiyi şəkildə olur.

c) Ruzi əlavəsi və əcəlin gecikdirilməsi insanlara nisbətdə təxirə salınmış iş kimi təqdir (müəyyən) edilmiş, sanki «filankəs qohumluq əlaqəsini qorusa, əlli il, qorumasa, qırx il yaşayacaqdır» kimidir. Allaha nisbətdə təxirə salınmış tərəfi yoxdur.

d) Əcəlin gecikməsi, ömrün bərəkəti ilə və sahibini xeyirli işlərə müvəffəq etməklə olur. Beləcə qısa ömründə başqalarının etmədikləri xeyirli işləri edər, onlardan çox yaşamış olar.

İmam Nəvəvi son fikri daha düzgün fikir kimi qiymətləndirmişdir.

• *Ənəsdən (Allah ondan razı olsun!) rəvayət edilir: «Ən çox xurmalıq Mədinə ənsarlarından olan Əbu Təlhada idi. Ən çox sevdiyi xurmalığı da*

*Peyğəmbər məscidinin qarşısındakı «Bəyraha» adlı bağçası idi. Peyğəmbərimiz ora girər, dadlı su içərdi. Əbu Təlha* «**Sevdiyiniz şeylərdən (haqq yolunda) sərf etməyincə savaba çatmazınız...»** (Ali-İmran, 92) *ayəsi nazil olduqda, Rəsulullaha belə dedi: «Ya Rəsulullah! Allah təbarəkə və təala* **«Sevdiyiniz şeylərdən (haqq yolunda) sərf etmədikcə savaba çatmazsınız»** *buyurur. Ən sevdiyim mal «Bəyraha» xurmalığıdır. Onu Allah rizası üçün sədəqə etdim. Allah dərgahında onun xeyrini və savabını umaram. Ya Rəsulullah, oradan Allahın sənə göstərdiyi şəkildə istifadə et». Rəsulullah (s.a.v.): «Çox gözəl, bu sənin üçün xeyirli bir maldır, xeyirli bir maldır»-dedi və belə buyurdu: «Nə dediyini eşitdim, mən də o xurmalığı qohumların arasında bölüşdürməyini uyğun görürəm». Əbu Təlha: «Elə edərəm, ya Rəsulullah!»-dedi və qohumlarına və əmisi oğullarına bölüşdürdü»* (əl-Buxari; Kitabul-Vəsaya, Kitabul-Zəkat, Müslim; Kitabul-Zəkat, 998).

Dostun xəbəri olmadan quyusundan su içmək, ağacından meyvə dərmək, yeməyindən yemək mübahdır. Lakin burada diqqət ediləsi şey dostunun bundan məmnun olacağını bilməkdir. Xeyir və itaətin nə cür edilməsi məsələsində alimlər ilə məsləhətləşmək sünnətdir. Çox sədəqə verərkən sahibini öyməyə (mədh etməyə) icazə verilməsi hədisdən görünür. Sədəqəni ehtiyacı olan qohumlara vermək başqalarına verməkdən daha fəzilətlidir. Çünki bu cür yardım zamanı həm qohumluq əlaqəsini qorumağa görə əcr, həm də sədəqə əcri qazanılır.

Sevdiyini paylayanlardan biri də xəlifə Ömər bin Abdul Əziz idi. O, kisələrlə şəkər alardı, fağır-füqərəyə paylayardı. Ondan soruşanda ki: «Nə üçün belə edirsən, pulunu versən olmazmı?» O: «Mən şəkəri çox sevirəm. Ona görə sevdiyim şeyi paylamaq istədim» şəklində cavab vermişdi.

• *Abdullah bin Amr bin əl-As (Allah ondan razı olsun!) rəvayət edir: «Bir nəfər Peyğəmbərin (s.a.v.) yanına gələrək dedi: «Allahdan əvəzini umaraq hicrət etmək və cihad etmək şərtilə sənə beyət edirəm». Rəsulullah: «Ana və atandan sağ olanı varmı?»-deyə soruşdu. Dedi: «İkisi də sağdır». Rəsulullah: «Allahdan əcrmi istəyirsən?»-soruşdu. Dedi: «Bəli». Peyğəmbər: «Elə isə qayıt ana və atanın yanına, onlarla yaxşı davran»* (əl-Buxari; Kitabul Cihad, Müslim; Kitabul-Birr vəs-Sila, 2549, Əbu Davud; 2529, ən-Nəsai; 6/10, 7/143).

Əl-Buxari və Müslimin digər rəvayətinə görə, gələn adam cihad üçün izin istədikdə Rəsulullah soruşdu: «Ata-anandan sağ olanı varmı?». Adam «bəli» deyincə Rəsulullah: «Sənin cihadın onların yanında olmandır» buyurdu.

Hədis, ata-anaya itaətin şiddətli lüzumunu, haqqlarının böyüklüyünü, onlara itaətə görə qazanacaqları savabın çoxluğuna işarə edir. Alimlərin bəziləri bu hədisi dəlil gətirərək, ana-ata haqqının cihaddan daha üstün olduğunu, hər ikisi və ya biri müsəlman olduğu halda, onlardan icazəsiz cihada getməyə icazə verilmədiyini söyləmişlər. Müşrik olarlarsa, icazələri

şərt deyildir. Ancaq, düşmən müsəlmanların qarşısına gələrsə, onunla vuruşmaq zərurət halını alarsa, onların icazəsi olmadan cihad etmək olar.

Hədisdən həm də məlum olur ki, əgər hicrət vacibdirsə, ana-ata haqqı da öndə olan vaciblərdəndir. Əgər insanın öz dinini ana-atasının yanında yaşama imkanı varsa, onların rizası önə keçir. Yox, onların yanında dinini yaşaya bilmirsə, dini üçün ana-atanı tərk edərək hicrət edə bilər. Hədisdə ana-ataya itaət, cihaddan önə keçmişdir. Çünki ana-ataya yaxşılıq bütünlüklə hamının borcudur-«farzi-ayn»dır, cihad bütünlüklə hamının borcu deyil-«farzi-kifayə»dir. Şübhəsiz, bu hökm bir qrupun cihada getməsi ilə məsələnin həll olunacağı vəziyyət üçündür. Bütünlüklə hamının ayağa qalxması zəruri olduqda isə cihad «farzi-ayn» olur, hər kəsin iştirak etməsi vacibdir.

• *Abdullah bin Amr bin əl-Asdan (Allah ondan razı olsun!) Rəsulullahın (s.a.v.) belə buyurduğu rəvayət edilmişdir: «Qohumlarının göstərdiyi yaxşılığa eyni ilə cavab vermək, qohumluq əlaqəsini qorumaq demək deyildir. Əslində, qohumluq əlaqəsini qorumaq, onlar münasibətlərini kəsdikləri zaman, onlarla maraqlanıb münasibəti davam etdirməkdir»* (əl-Buxari; Kitabul-Ədəb, ət-Tirmizi; 1909, Əhməd bin Hənbəl, Əbu Davud; 1697, ən-Nəsai).

Hədisədki «qohumluq əlaqəsini qorumaq demək deyil» ifadəsindəki məqsəd «kamil mənada qohumluq əlaqəsini qorumaq deyil» mənasını verməkdir. Zahirən, qohumlarına maraq göstərmək, bu əlaqəni qorumaq deməkdir. Lakin kamil mənada isə, onlar əlaqəni kəsdikləri anda belə, münasibəti kəsməməkdir. Əgər qohumluq əlaqəsini dərəcələndirsək, deyə bilərik: «Muvasil»-yüksək səviyyədə qohumluq əlaqəsinə riayət edən, münasibətlərdə daim öndə olandır. «Mükafi»-münasibətdə aldığından artıq bir şey verməyəndir, «Mükati» özünə hörmət edilib, qohumları tərəfindən maraq göstərildiyi halda cavab verməyəndir.

Göründüyü kimi hədisdə, qohumluq əlaqələrinə riayət etməyə həvəsləndirməyə, onlar münasibəti azaltsalar da, bizim həmin münasibəti artıraraq davam etdirməyimizə işarə edilir.

• *Həzrəti Aişədən (Allah ondan razı olsun!) Rəsulullahın (s.a.v.) belə buyurduğu rəvayət edilir: «Qohumluq əlaqəsi ərşdən asılmış və belə demişdir: «Məni gözləyəni, Allah da gözləsin. Mənimlə münasibəti kəsəndən də Allah rəhmətini kəssin»* (əl-Buxari; Kitabul-Ədəb, Müslim; Kitabul-Birr vəs-Sila; 2555).

Hədisdə qohumluq əlaqəsinin Allahın rəhmətini cəlb etməsinə və bu laqəni kəsmənin Allahın qəzəbinə səbəb olmasına işarə var.

• *Möminlərin anası Meymunə bint əl-Harisdən (Allah ondan razı olsun!) rəvayətə görə o, Peyğəmbərdən (s.a.v.) icazəsiz cariyə (kəniz) azad etmişdi. Meymunənin növbəsi zamanı Peyğəmbər (s.a.v.) onun yanına gələndə: «Ya Rəsulullah, fikir verdinmi, cariyəni azad etmişəm». Rəsulullah (s.a.v.): «Cariyəni azad etmisən?»-deyə soruşdu. O: «Bəli»-dedikdə,*

*Peyğəmbər (s.a.v.): «Əgər onu dayılarından birinə versəydin, əcrin daha çox olardı» buyurdu»* (əl-Buxari; Kitabul-Hibə, Mülim; Kitabul-Zəkat; 999, Əbu Davud 1690).

Hədisdən, qadının öz malına ərindən icazəsiz sahiblik səlahiyyətinə malik olması, qohumlara hörmətin üstünlüyü anlaşılır. Çünki hədisdə köləni azad etməkdənsə, onu qohumlara hədiyyə etməyə işarə vardır. Buna görə ehtiyacı olan qohuma hörmət, kölə azad etməkdən fəzilətlidir. Çünki əvvəldə də deyildiyi kimi, sədəqənin qohuma verilməsinin iki savabı vardır: biri sədəqənin, digəri qohumluq əlaqəsinin.

• *Əbu Bəkrin qızı Əsma (Allah ondan razı olsun!) belə rəvayət edir:*

*-Rəsulullah həyatda ikən müşrik olan anam bizə gəlmişdi. Mən ona vəziyyəti danışdım və: «Anam gəlib. O mənə ümid bəsləyir, onunla əlaqə saxlayımmı?»-deyə soruşdum. Peyğəmbərimiz (s.a.v.): «Bəli, anana lazımi qayğını göstər buyurdu»* (əl-Buxari; Kitabul-Hibə, Kitabul-Cizyə, Kitabul-Ədəb, Müslim; Kitabul-Zəkat, 1003, Əbu Davud; 1668).

Əbu Bəkir, Əsmanın anasını cahillik dövründə boşamışdı. Bu qadın Mədinəyə qızının yanına gəlmişdi. Gələrkən özü ilə bəzi hədiyyələri gətirmişdi. Ancaq qızı onun hədiyyələrini qəbul etməkdən, onu evinə aparmaqdan çəkinmişdi. Vəziyyəti Rəsulullaha aydınlaşdırmaq üçün həzrəti Aişəyə xəbər göndərmişdi. Rəsulullah da yuxarıdakı cavabı vermişdi.

Hədisdən görünür ki, kafir, müşrik ana-ataya yardım etməyə icazə verilir. Düşmənlə sülh bağlamağa, ticarət etməyə icazə verilir. Qohumları ziyarət üçün səfərə çıxmağa icazə var və fəzilətlidir.

• *Abdullah ibn Məsudun arvadı Zeynəb əs-Saqafiyyədən (Allah ondan razı olsun!) Rəsulullahın belə buyurduğu rəvayət olunur: «Ey qadınlar! Zinətlərinizdən də olsa, sədəqə verin». Zeynəb deyir: «Abdullah bin Məsudun yanına qayıdıb ona dedim:*

*-Sən yoxsul bir kimsəsən. Rəsulullah bizə sədəqə verməyimizi əmr etdi. Mən sədəqə verəcəyəm. Əgər sədəqəmi sənə vermək düzgündürsə, sənə verim, yox, ərə sədəqə verilməzsə, başqasına verim. Get, vəziyyəti Rəsulullahdan soruş.*

*Abdullahın «sən get, soruş» dediyinə görə Rəsulullahın evinə getdim. Qapısında eyni məsələni soruşmaq üçün gələn ənsardan bir qadın da gözləyirdi. Bu zaman Rəsulullah qəzəbli bir halda idi. Bayıra Bilal çıxdı. Biz ona: «Get, Rəsulullaha bizim kim olduğumuzu söyləmədən xəbər ver ki, qapıda iki qadın durub, ərlərinə və ərlərinin evdə tərbiyə etdikləri yetimlərə sədəqə verməyin düzgün olub-olmadığını soruşurular» dedik.*

*Bilal içəri girib soruşduqda, Rəsulullah dedi: «Kimdir onlar?» Bilal dedi: «Ənsardan bir qadın və Zeynəb». Rəsulullah: «Hansı Zeynəb?»- deyə soruşdu. Bilal dedi: «Abdullahın arvadı». Peyğəmbər buyurdu: «Onlara ikiqat savab var. Biri yaxınlarını çətinlikdən qurtarmalarına görə, digəri isə Allah üçün sədəqə verdiklərinə görə»* (əl-Buxari; Kitabuz-Zəkat, Müslim; Kitabul-Zəkat, 1000).

Qadınlar Bilala özlərinin kim olduqlarını söyləməməsini tapşırmalarına baxmayaraq, o bu sirri açmışdı. Çünki peyğəmbərin sualı bu sirri açmışdı. Söyləməməsi düzgün olsa da Peyğəmbərə cavab verməsi daha məsuliyyətlidir. Çünki Rəsulullaha cavab vermək gecikdirilməsinə icazə verilməyən bir vacibdir. İki məsləhətdən daha mühüm olanı icra edilir.

Hədis, dövlət başçılarının fitnələrindən qorunması şərtilə əhaləsinə sədəqə verməsinə, Allah rizası üçün yaxşılıqlar etməsinə dəlildir. Hədisdə qadınların dini məsələləri öyrənmək üçün evindən çıxıb məclislərə gedə bilmələrinə, çətin bir məsələdə ərlərindən soruşmalarına işarə vardır.

• *Əbu Sufyan Saxr bin Hərbin (Allah ondan razı olsun!) Həbəşistan kralı Herakl ilə olan söhbətindən bəhs edən uzun hədisinin bir hissəsində buyurulur ki, Herakl Əbu Sufyandan peyğəmbərin nəyi əmr etdiyini soruşdu. Əbu Sufyan dedi: «Mən də cavab verdim: «Yalnız vahid Allaha ibadət edin, heç bir şeyi Ona şərik qoşmayın, atalarınızın dediklərini tərk edin». Bizə namaz qılmağı, doğruluğu, namuslu olmağı və qohumluq əlaqələrini qorumağı əmr edir»* (əl-Buxari; Kitabu Bedil-Vəhy, Müslim; Kitabul-Cihad, 1773).

«Heç bir şeyi Ona şərik qoşmayın» ifadəsində «şərik qoşma» kəlməsi ümumi mənadadır. Buna ən böyük şirk olan «küfr» kimi, ən kiçik şirk olan «riya» da daxildir. Beləcə «kiçik-böyük şirkin hər növündən çəkinərək, Allahı pak və nöqsansız qəbul edib ona ibadət edin» buyurulur. «İbadət etmə»də məqsəd yalnız Allah rizasını qazanmaq və Ona yaxınlaşmaqdır. Bu zaman digər heç bir kimsənin və şeyin rizası və xətri nəzərdə tutulmamalıdır.

Hədis ümumilikdə Rəsulullahın gətiriyi İslami təbliğin xüsusiyyətlərindən irəli gəlir. Heraklın davranışı belə bir gerçəkliyi də xatırladır ki, islami mənada iman, kor-korənə təqlid deyil, araşdıraraq, dəlilləri təhlil edərək inanmaqdır.

Hədisdə tovhiddən sonra, cəmiyyət qayda-qanunlarını təmin edəcək şeylərə diqqət edilmişdir. Doğruluq, namuslu olmaq və qohumluq əlaqələrini gözləmək, xoşbəxt bir cəmiyyət üçün zəruri prinsiplərdir.

• *Əbu Zərrdən (Allah ondan razı olsun!) Rəsulullahın belə buyurduğu rəvayət edilmişdir: «Siz yaxın vaxtlarda «karatın» çox söyləndiyi bir yeri fəth edəcəksiniz».*

Başqa rəvayətdə: *«Siz yaxın vaxtlarda karatın söyləndiyi bir yer olan Misiri fəth edəcəksiniz. Əhalisi ilə yaxşı davranın, çünki onların bizə borc və qohumluğu vardır».*

Digər rəvayətdə bu dəyişiklik vardır*: «Oranı fəth edəcəyiniz zaman xalqı ilə yaxşı davranın, çünki onlarla aranızda borc və qohumluq vardır»* (Müslim; Kitabul-Fədail, 2543, 226, 227).

Hədis, peyğəmbərin möcüzələrindən biridir. Misirin fəthindən əvvəl, oranın fəth ediləcəyini bildirmişdir. Fəth edilən ölkələrdə müsəlmanlarla qohum olanlar vardırsa, onlarla yaxşı münasibətdə olmaq tövsiyə edilir.

«Misirlilərlə müsəlmanların borc və qohumluq əlaqələri vardır» sözü ilə bir şey açıqca söylənməyib, başqa bir məna ilə ifadə edilmişdir. Həzrəti İsmayılın (Ona salam olsun!) anası Həcər misirlidir. Həcəri İbrahimin arvadı Saraya Cabbar vermişdir. Sara da İbrahimə hədiyyə etmiş və ondan da həzrəti İsmayıl (Ona salam olsun!) dünyaya gəlmişdir. Bu cəhətdən misirlilərlə qohumluq əlaqəsi mövcuddur.

Digər tərəfdən peyğəmbərimizin oğlu İbrahimin anası Mariya da misirli idi. Rəsulullah (s.a.v.) Misir padşahına İslama dəvət məktubu göndərdiyi zaman, o, islamı qəbul etməmiş, ancaq Rəsulullaha iki cariyə (kəniz) hədiyyə göndərmişdir. Mariya adlısını özünə almış, Sirin adlı digərini isə Həssan bin Səbitə vermişdi. Həmin Mariyadan peyğəmbərin oğlu İbrahim anadan olmuşdu. Bu cəhətə görə də misirlilərlə müsəlmanların yaxınlığı vardır.

• *Əbu Hureyrə (Allah ondan razı olsun!) deyir ki:* **«Və ən yaxın qohumlarını qorxut»** *(əş-Şüara, 214) ayəsi nazil olanda, Rəsulullah ümumi və xüsusi mənalı kəlimələrlə onlara belə müraciət etdi: «Ey Abdi-Şəms oğulları! Ey Kəb bin Lueyy oğulları! Özünüzü cəhənnəm atəşindən qoruyun! Ey Abdi-Mənaf oğulları! Özünüzü cəhənnəm atəşindən qoruyun! Ey Həşim oğulları! Özünüzü cəhənnəm atəşindən qoruyun! Ey Abdi-Muttalib oğulları! Özünüzü cəhənnəm atəşindən qoruyun! Ey (qızım) Fatimə, özünü cəhənnəm atəşindən qoru! Çünki mən Allahdan sizə gələcək əzabı dəf edə bilmərəm. Mənim edə biləcəyim şey, ancaq sizinlə aramda olan qohumluq əlaqəsinə riayət etməkdir»* (Müslim; Kitabul-İman, 204, ən-Nəsai; Kitabul-Vəsaya).

Küfr və üsyandan üz çevirərək iman etməklə, nəfsləri cəhənnəm atəşindən qorumaq olur. İnsan cəhənnəm əzabından bu şəkildə qorunmuş olur.

Qövmlərindən bir peyğəmbərin gəlməsi və ya peyğəmbərin çox yaxını olmaq insanı Allahın verəcəyi əzabdan qurtarmaz. Yaxınları olan, aralarında qohumluq əlaqəsi olan peyğəmbər onların hallarına acıyır, üzülür, onlara mərhəməti bəlkə bir az artıq olduğundan hidayətə qovuşmaları üçün çalışır, lakin qəbul etməsələr, gələcək əzabı dəf etmə imkanı yoxdur.

«Qohumluq əlaqələrinə riayət etmək» də onların xeyrinə olan şeylərdə onlar üçün məşğul olmaq, yardım etmək və doğrunu göstərməklə olur.

Hədis, insanın öz əməlinə baxmasını və yaxşı əməllərini çoxaltmasını tövsiyə edir. Çünki hər kəs öz əməlinin əvəzini görəcəkdir.

• *Əbu Abdullah Amr bin əl-As (Allah ondan razı olsun!) deyir: «Rəsulullahın açıq-aşkar belə dediyini eşitdim: «Qohumum olan filan sülalə dostlarım deyildir. Mənim dostlarım Allah və saleh möminlərdir. Ancaq o sülalə ilə aramızda qohumluq əlaqəsi vardır və o əlaqəyə riayət edirəm»* (əl-Buxari; Kitabul-Ədəb, Müslim; Kitabul-İman, 215).

İnsanın həyatda münasibətdə olduğu insanlar iki cürdür. Biri eyni

məkana, sənətə və işə malik olduqları üçün bir yerdə olub münasibət bəsləməli olan insanlar, digəri isə bu məcburiyyətlə olmasa da, dostluq bağı ilə əlaqəli olan insanlardır. Mömin sülh şəraitində kafirlə münasibət yaradıb, alış-veriş edə bilər. Lakin aralarında dostluq əlaqəsi yoxdur. Hərb olmadığı müddətdə qarşı tərəfdən qohumları ilə əlaqə yaradıb, qohumluq əlaqələrinə riayət edə bilər. Müsəlmanların dostu ancaq müsəlmanlardır. Quran ayəsi də bunu təsdiqləyir: **«...Əgər Peyğəmbərə qarşı bir-birinizə kömək etsəniz (bilin ki,) Allah onun hamisi, Cəbrail, əməlisaleh möminlər və bunlardan sonra (bütün) mələklər də onun köməkçiləridir»** (ət-Təhrim, 4).

Hədis imanı kamilləşdirməyə həvəsləndirir.

• *Əbu Əyyub Xalid bin Zeyd əl-Ənsari (Allah ondan razı olsun!) bir nəfərin belə dediyini rəvayət edir: «Ya Rəsulullah! Məni Cənnətə salacaq və Cəhənnəmdən uzaqlaşdıracaq bir işi xəbər ver». Peyğəmbər (s.a.v.) dedi: «Allaha ibadət edərsən, heç bir şeyi Ona şərik qoşmazsan, namazı daim düzgün qılarsan, zəkatı verərsən və qohumlarınla münasibətini kəsməzsən»* (əl-Buxari; Kitabuz-Zəkat, Müslim; Kitabul-İman, 13, ən-Nəsai; Kitabus-Salat).

Hədis, insanı cənnətə salacaq əməlləri ehtiva edir. Hədisdən görünür ki, bu əməllər iman gətirmək və ibadət etməkdir. Qurani-Kərimdə «İman gətirib saleh əməllər işləyənlərə cənnət vardır» şəklində çox təkrarlanan ayələr də hədisi qüvvətləndirir. «Saleh əməl» ibadətin digər mənasıdır. Çünki Allahın rizasını qazandıracaq, Onu razı salacaq hər bir əməl ibadətdir.

Peyğəmbərin insanı Cənnətə salacaq əməlləri içərisində qohumlarla münasibəti zikr etməsinin səbəbi, sualı verənlə bağlıdır. Çünki sual verən bəlkə də qohumlarıyla əlaqəsini kəsmişdir. Ona ibrət olsun deyə bunu söyləmişdir. Çünki qarşısındakı həmsöhbətinin vəziyyətinə görə danışması Rəsulullahın xüsusiyyətlərindəndir. Digər tərəfdən də qohumluq əlaqələrini qorumağın üstün bir əməl olub, insanın cənnətə girməsinə səbəb olacağı açıqca göstərilir.

• *Səlman bin Amirdən (Allah ondan razı olsun!) Rəsulullahın belə buyurduğu rəvayət olunur: «Sizdən biri iftarı xurma ilə etsin. Çünki xurma bərəkətdir. Xurma olmasa, su ilə iftar etsin, çünki su da pakdır». Daha sonra buyurdu: «Yoxsullara verilən sədəqə bir sədəqədir. Qohumlara verilən sədəqə isə iki sədəqə yerinədir. Biri sədəqədir, digəri qohumluq əlaqəsini qorumaqdır»* (ət-Tirmizi; Kitabuz-Zəkat, 658, Əbu Davud; 2355, Əhməd bin Hənbəl, ən-Nəsai; 5/92, İbn Macə; 1844, Darimi).

Xurmanın məlum olan və gələcəkdə kəşf ediləcək bir çox faydaları mövcuddur. Gözə, mədəyə olan faydaları buna misal ola bilər.

Suyun pak olması da məlumdur. Su həm pak, həm də təmizləyicidir. Maddi və mənəvi pisliklər (təharət, dəstəmaz, qüsul) su ilə təmizlənir. Böyük və kiçik təharət dəstəmaz və qüsul ilə yerinə yetirilir. Əvvəlcə xurmanın, sonra suyun zikr edilməsinin səbəbi bir şeyin yaxşı və gözəl olmasıdır.

İnsanın, müqabilində daha çox savab qazanacaq yaxşılığı üstun tutması şübhəsizdir. Bildirildiyi kimi, qohumlara edilən yaxşılıq və sədəqə əcri ikiqatdır. Qohumların ana və ata tərəfdən olan və yaxından uzağa getdikcə genişlənən bir yaxınlıq olduğu məlumdur.

Hədis, qohumluq əlaqələrinin qorunmasının ucalığına işarədir.

• *İbn Ömərdən (Allah ondan razı olsun!) rəvayət edilmişdir: «Sevdiyim bir arvadım var idi. Atam Ömər onu xoşlamırdı. Boşamağımı söylədisə də, mən boşamadım. Atam Rəsulullahın yanına gedərək vəziyyəti ona bildirdi. Rəsulullah da mənə: «Onu boşa» buyurdu»* (Əbu Davud; Kitabul-Ədəb, 5138; ət-Tirmizi; Kitabul-Talaq, 1189).

Həzrəti Ömərin, oğluna arvadını boşatdırmağı məcbur etməsinə səbəb qadının dini baxımda olan qüsurlardan doğacaq fitnə idi. Oğlunun da boşamaması atasına qarşı üsyan deyil, həmin vəziyyətə uyğun müxtəlif fikirdə (ictihad fərqi) olması idi. O vaxt ki, Rəsulullahın fikri atasının fikrini doğrultdu, həmin anda itaət edərək arvadını boşamışdır.

Burada heç bir şübhə yoxdur ki, Rəsulullah Ömərin xətrinə onun oğluna zülm etməz. Ancaq kim haqlısa, həqiqət nədirsə, Rəsulullah onunla olmuş, haqsızlıq qarşısında susmamışdır.

Hədisdə, ataya itaətin kərəkliyi anladılırsa, Rəsulullaha itaətin isə şübhəsiz hər müsəlmana vacib olduğu vurqulanmış, İbn Ömərin itaəti örnək olaraq göstərilmişdir.

• *Əbu Darda (Allah ondan razı olsun!) deyir:*

*-Bir adam yanıma gəldi və soruşdu: «Bir arvadım var, anam boşamamı istəyir, nə edim, nə deyirsən?» Əbu Darda cavab olaraq Rəsulullahdan eşitdiyi bu hədisi ona söylədi: «Ana-ata cənnət qapılarının ortasıdır. İstəsən o qapını itir, istəsən mühafizə et»* (ət-Tirmizi; Kitabul-Birr vəs-Sila, 1901, Əhməd bin Hənbəl, İbn Macə və Hakim).

«Cənnət qapılarının ortasıdır» ifadəsindən məqsəd, anasına yaxşılıq edən kimsənin Cənnətə orta qapılardan girər deməkdir.

Hədisdə, ana-ata rizasının Allahın rizasını qazandırıb, cənnətə girməyə vəsilə olacağı anladılır. Doğru, haqq olan mövzularda onların əmrinə itaət etmək lazımdır. Çünki, Allah özünə itaətlə yanaşı valideynlərə itaəti əmr etmişdir.

• *Bəra ibn Azibdən (Allah ondan razı olsun!) Rəsulullahın belə buyurduğu rəvayət olunur: «Xala ana yerindədir»* (Müslim; Kitabul-Birr vəs-Sila, 1905, Əbu Davud; 2280).

Xalanın ana kimi olması şəfqət və mərhəmətin çoxluğuna nisbətlədir. Xalalar sevməkdə, acımaqda, yardım etmədə analar kimidir.

Hədis, xalaya yaxşılıq etməyə işarədir. Nəvəvinin bu hədisi burada zikr etməsinin səbəbi də xalaya yaxşılıq, hörmət və itaətin eyni ilə anaya olmasına diqqət etmək üçündür.

